**KİMYA**

**CHEMISTRY**

DOI: https://doi.org/10.36719/2707-1146/24/19-24

**Ceyran Teymur qızı Rüstəmova**
AMEA-nın M.Nağıyev ad. Kataliz və Qeyri-Üzvi Kimya İnstitutu
kimya üzrə fəlsəfə doktoru
iradam@rambler.ru
**Arif Cavanşir oğlu Əfəndi**
AMEA-nın M.Nağıyev ad. Kataliz və Qeyri-Üzvi Kimya İnstitutu
kimya elmləri doktoru
arifjavanshir@mail.ru
**Fəridə Əli qızı Abdullayeva**
AMEA-nın M.Nağıyev ad. Kataliz və Qeyri-Üzvi Kimya İnstitutu
kimya üzrə fəlsəfə doktoru
farida.abdullayeva@mail.ru
**Firuzə Ələsgər qızı Yunisova**
AMEA-nın M.Nağıyev ad. Kataliz və Qeyri-Üzvi Kimya İnstitutu
kimya üzrə fəlsəfə doktoru
firuza.alasgar@mail.ru
**Tamella Adil qızı İsmayılova**
AMEA-nın M.Nağıyev ad. Kataliz və Qeyri-Üzvi Kimya İnstitutu
tamella.ismayilova@mail.ru
**Minayə Fikrət qızı Nəbiyeva**
AMEA-nın M.Nağıyev ad. Kataliz və Qeyri-Üzvi Kimya İnstitutu
minaya.nabiyeva@mail.ru
**Samir İsa oğlu Məmmədov**
Azərbaycan Dövlət Neft və Sənaye Universiteti
samir.mammadov@mail.ru

# SEOLİTLƏRİN FİZİKİ-KİMYƏVİ XASSƏLƏRİNİN SORBENTLƏRİN ADSORBSİYA QABİLİYYƏTİNƏ TƏSİRİ

**Xülasə**

Təqdim olunan işin məqsədi müxtəlif qatılıqlı duzların (0,5±1,0n) $NH_4Cl$ məhlulu ilə işlənmiş təbii klinoptilolit seoliti nümunələri əsasında alınmış sorbentlərin effektivliyinin öyrənilməsidir. Məhlulda adsorbatın miqdarının artması ilə azot-oksigen binar qarışığından azotun adsorbsiya miqdarı 6,2mmol/q-a qədər artır. Lakin qeyd etmək lazımdır ki, seolit nümunələrinin həcmləri çox qısa vaxtda – 120 san ərzində dolur və yaxud tutulur. Baxılan işdə adsorbsiya-desorbsiya proseslərinə təsir edən amillərdən olan təzyiq və kontakt vaxtının adsorbsiyaya təsiri də öyrənilmişdir. $NH_4Cl$ molekuluna əsasən adsorbsiya qabiliyyətinin təbii seolitlərin səth təbəqələrindəki aktiv mərkəzlərin təbiətindən asılılığı da müəyyən olunmuşdur.

***Açar sözlər:*** *seolit, klinoptilolit, kation, silisium, spektr, udulma zolaqları, sorbent, izoterma, alümosilikat*

**Jeyran Teymur Rustamova**
**Arif Javanshir Efendi**
**Farida Ali Abdullayeva**
**Firuza Alasgar Yunisova**
**Tamella Adil Ismayilova**
**Minaya Fikrat Nabiyeva**
**Samir Isa Mammadov**

# Influence of physical and chemical proporties of zeolites on their adsorption abilities

**Abstract**

The purpose of this work was to study the effectiveness of zeolite samples after treating natural clinoptilolite with $NH_4Cl$ solutions of various concentrations (0,5÷1,0n). With an increase in the solution, the amount of nitrogen adsorption from binary mixtures increases, and nitrogen to oxygen increases to 6.2mq/q. However, it should be noted that the sample volume of the zeolite proceeds for 120 seconds. The effect of adsorption parameters – desorption, pressure, and contact time on the adsorption process was also studied. The adsorption capacity with respect to the $NH_4Cl$ molecule depends on the nature of the active centers on the surface of the natural zeolite.

***Keywords:*** *zeolite, clinoptilolite, cation, silicon, spectrum, adsorption bands, sorbent, isotherm, aluminosilicate*

## Giriş

Azərbaycan Respublikasında zəngin olan Ay-Dağ yatağından götürülmüş sənaye əhəmiyyətli təbii seolit – klinoptilolit əsasında hazırlanmış adsorbent nümunəsi tədqiq olunmuşdur. Dünyanın bir çox ölkələrində təbii seolitlərin tədqiq və tətbiq sahələr çox müxtəlifdir və tərkibində 85-90% seolit olan təbii süxurların öyrənilməsi problemi beynəlxalq xarakter daşıyır. Təqdim olunan bu işdə təbii və modifikasiya olunmuş seolitlərin fiziki-kimyəvi xassələrinin onların adsorbsiya qabiliyyətinə təsir mexanizmi öyrənilmişdir. Məlumdur ki, təbii klinoptilolitlər iri kationlara qarşı nəzərə çatacaq dərəcədə seçicilik qabiliyyətinə malikdir (Amirov, 2004:220).

Təbii seolitlərin termiki dayanıqlıqlarına (873-1073K) kationların təbiətindəki müxtəlif dəyişikliklərin təsiri müəyyən olunmuşdur. Bu səbəbdən də seolitin özündə saxladığı ionlar yüksək temperatura davamlı olur. Kationun yükü nə qədər böyük olarsa, seolitin davamlılığı da bir o qədər yüksək olur. Məsələn, lantan ionu [$La^{3+}$] sezium ionundan [$Cs^{+}$] çox effektlidir (Zhdanov, Yegorova, 1968:101-110; Danilova, Zonkhayeva, 2013:1361-1365).

$$La^{3+} < Li^{+} < Na^{+} < Ca^{2+} < Sr^{2+} < Ag^{+} < K^{+} < Ba^{2+} < NH_4^{+} < Rb^{+} < Cs^{+}$$
$$1{,}03A<1{,}36<1{,}90<1{,}98<2{,}262<2{,}265<2{,}266<2{,}7<2{,}86<2{,}94<3{,}38A$$

$NH_4^{+}$formalı klinoptilolit nümunəsi üçün ion radiuslarının artması ilə qarışıqların paylanma əmsalları kəskin sürətdə artır. Effektivlik əmsalı, daxil olan ionun radiusundan və xarici məhlulun qatılığından asılı olur. Təcrübi olaraq təbii klinoptilolitdə kationun dəyişdirilməsi aparılmışdır. Əgər ammonyaklı ($NH_3$)–formada adsorbsiya kəmiyyətinin azalması müşahidə olunursa, əksinə protonlaşdırmadan ($H^{+}$) sonra nümunənin keyfiyyət göstəricilərinin artması müşahidə olunmuşdur.

*Cədvəl 1.*

**Paylanma əmsalının kationun ion radiusundan asılılığı**

| Kation | $La^{3+}$ | $Li^{+}$ | $Na^{+}$ | $Ca^{2+}$ | $Ba^{2+}$ | $NH_4^{+}$ | $Cs^{+}$ |
|---|---|---|---|---|---|---|---|
| İon radiusu, A | 1,03 | 1,36 | 1,90 | 1,98 | 2,70 | 2,86 | 3,38 |
| Paylanma əmsalı ($K_p$) | 0,62 | 0,65 | 0,67 | 0,85 | 0,90 | 0,94 | 0,81 |

Qarşılıqlı təsirlərin xarakterini qiymətləndirmək üçün kationların elektrostatik sahələrinin adsorbsiya olunmuş molekulların polyarizasına müsbət təsir göstərdiyini nəzərə almamaq mümkün deyil, belə ki, kationun polyarizasiya təsirinin artması ilə seolitin səthində daha güclü turşu mərkəzlərinin əmələ gəlməsi müşahidə olunur (Chelishchev, 1973:12-15).

Adsorbsiya prosesinin effektivliyi, verilmiş şəraitdə daxil olan ionun radiusu və qarışıqda olan qazın qatılığından asılı olur. Məlum seolit sorbentin (təbii klinoptilolit) mikroməsamələrinin güc sahələrinə təsir etmək üçün iondəyişmə kationlarından birini və ya hamısını dəyişdirmək lazımdır. Modifikasiya olunmuş klinoptilolit nümunələrində əvvəlcə diametri 3 mm, hündürlüyü 4-5 mm olan silindrdə dənəvərlər hazırlanır. Sonra dənələr 673-773K temperaturda 4 saat ərzində dehidratasiya edilir. Modifikasiya olunmuş klinoptilolit nümunəsinin kütlə fərqi derivatoqrafiya üsulu ilə 393-873K intervalında təyin edilir.

İlkin seolit nümunəsini 0,1-0,5 mm ölçüdə xırdaladıqdan sonra aşağıdakı qaydada modifikasiya olunur. Əks soyuducusu olan və istiliyi sabit saxlayan şüşə qaba xırdalanmış klinoptilolit doldurulur və üzərinə 10 ml/q miqdarında $NH_4Cl$ məhlulu əlavə olunur. Mübadilə aşağıdakı sxem üzrə baş verir.

$$NH_4Z \rightarrow HZ + NH_3$$

İon mübadiləsi 193-303K temperaturda 6 saat ərzində arasıkəsilmədən qarışdırmaqla həyata keçirilir. Modifikasiya olunmuş nümunələri filtirdən keçirib 24 saat müddətində 393K temperaturda qurudulur. Qurudulduqdan sonra nümunələri sabit çəkiyə gətirmək üçün onları 198-303K və 1 mm c.st. su buxarı təzyiqi olan eksikatorda saxlanılır. Bundan sonra yalnız $NH_4^+ = 1,98\%$ kation tərkibini təyin etmək üçün nümunə götürülür (Yevdokimova, Karotsuba, Lankin, 2010:15-21).

Kationların mübadiləsi ilə modifikasiya olunmuş nümunələrin termiki davamlılığı (973K-dən yüksək) və adsorbsiya tutumu qənaətbəxş dərəcədə yüksəlir. Termiki davamlılıq Si/Al nisbətinin artımı ilə müşahidə olunur. Qarşılıqlı təsirlərin xarakterini qiymətləndirmək üçün kationların elektrostatik sahələrinin adsorbsiya olunan molekulların molyarlaşmasını nəzərə almaq vacibdir.

Adsorbsiya olunmuş müxtəlif molekulların kritik diametrləri aşağıdakı kimidir, Å:

$$He < H_2O < H_2 < CO_2 < O_2 < N_2 < CH_4 < C_2H_4 < C_3H_8 < C_6H_{14} < CH_3OH$$

2,60 2,70 2,89 3,30 3,46 3,64 3,80 4,07 4,30 4,40 4,42

Adsorbsiya prosesi ilə havanın oksigenlə zənginləşməsinin təbii klinoptilolitin kation tərkibindən asılılığı öyrənilmişdir. Prosesin effektivliyi onun seçiciliyi və onun texnoloji reallaşdırma şərtləri ilə müəyyən olunur. Havanın əsas komponentləri olan azot və oksigenin fiziki xarakterləri bir-birinə çox yaxındır. Azot və oksigenin ən başlıca fərqi azot molekulunda kvadratvari momentlərin olmağıdır ki, bu da onun molyar sorbentlərdə qarşılıqlı təsirinə təkan verir. Təbii klinoptilolitin azota qarşı seçicilik xassəsindən sənayedə havanın oksigenlə zənginləşdirilməsi prosesində istifadə olunur (Abdurrakhmanov, Patiyev, Alekhina, 2010:85-89). Həmçinin adsorbsiya prosesinin göstəricilərinə təzyiqin və kontakt vaxtının təsiri də öyrənilmişdir. Havanın zənginləşdirilməsi onun başlanğıc təzyiqinin (3,5-4,8 kq/sm$^2$) və kontakt vaxtının (40-120 gün) dəyişdirilməsi ilə aparılmışdır (Annagiyev, 1992:50-90).

Şəkil 1-də qazın kontakt vaxtının desorbsiyasınınasılılığı göstərilmişdir.




**Şəkil 1. Desorbsiya olunmuş [$O_2$] (*a*, mol/q, P = 4,5atm) qazının miqdarına kontakt vaxtının təsiri**

Kontakt vaxtının desorbsiya olunmuş ($O_2$) qazın miqdarına təsiri (*a*, mq/q) P = 4,5atm-dir. Şək. 1-də kontakt vaxtının oksigenin qatılığına və desorbsiya olunmuş qazın həcminə əks təsiri göstərilmişdir. Aydın olur ki, başlanğıc təzyiqin 3,5-4,5 atm. artması ilə oksigenin qatılığı azalır, lakin bəzi nümunələr desorbsiya olunmuş qazın həcmi kontakt vaxtının artması ($\tau$ = 90 ÷ 120 san) ilə azalır. İQ-spektrin ölçülməsində spektrometrdən Perkin Elmer-457 və başqa cihazlardan istifadə edilmişdir. Təqdim olunan işdə həm də təbii seolitlər – klinoptilolit əsasında azotun xloroksidlərinin adsorbsiyası öyrənilmişdir. Seolit fazası üçün tetraedrik əlaqələrarası rəqslərin udulma zolağı 468, 527 və 648 $sm^{-1}$ müşahidə olmuşdur. Turşunun qatılığını artırdıqca spektrdə 800 və 943 $sm^{-1}$ ölçülü yeni zolaqlar əmələ gəlir və güclənirlər. Bu daspektrdəki 965 $sm^{-1}$ zolaqların Si – O – Si körpülərinin simmetrik valent rəqsləri ilə əlaqələndirilir (Littl, 1969:515; Senderov, Khitarov, 1970:395]. Bu göstərilənlər müəyyən qədər ümumiləşdirilmişdir.

Məlumdur ki, çox sayda kristal qəfəsli seolitlər güclü turşuların təsiri ilə parçalanırlar. Lakin tərkibində silisiumun miqdarı çox olan seolitlər ilə yüksək turşuya davamlılıq xassəsi ilə xarakterizə olunurlar. Yüksək silisiumlu seolitləri müəyyən qatılıqlı (0,5-1,0N) turşularla işlədikdə hidrogen ($H^+$) formalı seolitlər alınır (Rustamova, Efendi, Nasiri, Bayramova, Aliyev, Mamedov, Mansurova, 2018:6771).

Klinoptilolitin monokation formasını almaq üçün onu uyğun metalın duzunun qatı məhlulu ilə 353K temperaturda işləyirlər. Arada bir onu yuyurlar (1 q seolit + 10-20 ml $H_2O$). Xlorid turşusunun normallığını artırmaqla götürülmüş müxtəlif qatılıqların təsiri ilə spektrdə böyümə (artma) çox ləng gedir. Bu da seolitin yüksək dərəcədə turşuya davamlılığı ilə izah olunur. Uzun müddətli (1n) HCl ilə işlədikdən sonra udulma zolaqların 570 və 627 $sm^{-1}$ nəzərə çarpacaq dərəcədə zəifləməsi baş verir ki, bu da oksigen tetraedrlərinin xarici rabitələrinin (Si – Al) rəqsləri üçün xarakterikdir (Şək. 1).

Məlumdur ki, alümosilisiumoksigen (karkas) çərçivəsinin rəqsləri tezliyi oblastında (200 – 1300 $sm^{-1}$) müxtəlif seolitlərin kristal qəfəslərinin bəzi quruluş xarakteristikalarının alınmasında ən həssas üsul İQ-spektroskopiyadır (Rabo, 1980:502; Pribylov, Skibitskaya, Zakel, 2014:1043-1049). Bu üsul mineral turşuların təsiri ilə seolitlərin struktur quruluşunda baş verən dəyişikliklərin öyrənilməsində olduqca çox effektivdir.

Bildiyimiz kimi (Muminov, Aripov, 1987:4073) əgər istifadə olunan turşunun qatılığı (0,5n)-dan böyük deyilsə əsasən dekationlaşma prosesi baş verir və alüminium oksidin miqdarı dəyişmir. Bu [Si(Al)-O] qruplarının tetraedr daxili rəqsləri ilə əlaqədardır. Hər iki zolaq [OH] qruplarının valent rəqslərinə aid edilir ki, buna da seolitləri qızdırdıqda protonun [$H^+$] ayrılmasına kimyəvi reaksiyanın nəticəsi kimi baxılır.

Bu kimyəvi və quruluş çevrilmələri aşağıdakı kimi göstərilir:



II forma İQ-spektroskopiya ilə müşahidə olunmayan klassik Brensted turşu mərkəzini göstərir. Aşağı temperaturda (573K və aşağı) başlıca olaraq İQ-spektrdə görünən I forma mövcud olur. Bu sxemdə alümosilikatlarda temperaturun artması ilə elektrik keçiriciliyinin yüksəlməsi göstərilir. Hidroksil qrupları ($OH^-$) udulma zolaqlarının intensivliyi isə əksinə azalır. İQ-spektroskopiya üsulu ilə müəyyən olunmuşdur ki, 723K temperaturda $OH^-$-qruplarının zolaqlarının intensivliyi başlanğıc temperatura (393K) nisbətən 29% azalmış, 393K-dən aşağı temperaturda isə əvvəlki qiymətini almışdır.



I II

Al-dekationlaşdırılmış seolitlərin kationlaşma yerlərindəki vəziyyətləri Lyüis turşu mərkəzlərinə uyğun gəlir. Bu zaman alüminiumun tetraedrik vəziyyəti bərpa olunur ki, bu da bütün kationlaşdırılmış

seolitlər üçün xarakterikdir. İQ-spektrlərdə 3616sm$^{-1}$ zolaqla yanaşı daha çox dekationlaşdırılmış seolitlər 3564 sm$^{-1}$udulma zolağı da müşahidə edilmişdir.

Sonrakı tədqiqatlar üçün mordenit və klinoptilolitin hidrogen forması götürülmüşdür. Azot 4-oksidin adsorbsiya izoterminin analizi mikroməsamələrin həcminin dolması nəzəriyyəsinə uyğun gəlir (Muminov, Aripov, 1987:40-73; Rustamova, Efendi, Aliyeva, Melikova, Kozharova, Shikhlinskaya, 2017:35-37).

357 – 473K temperatur intervalında, vakuum – termiki üsulla aparılmışdır ki, bu da adsorbsiya izotermlərini başqa temperaturda hesablamağa və onların $P/P_S$ = 1 atm təzyiqdə ekstrapolyasiya olunmasına imkan yaradır.




**Şək. 2. Azot 4-oksidin adsorbsiya izotermləri: 1 – təbii seolitin hidrogen forması; 2 – təbii klinoptilolit**

Götürülmüş seolitlərdə azot 4-oksidin adsorbsiya izotermləri kiçik tarazlıq təzyiqində qaz fazada tövsiyyə olunan spektrofotometriyası çəkilmişdir.

$NO_2$ desorbsiyasının kinetikası vakuum-termiki üsul ilə 298-473K temperaturda İQ-spektrofotometriyanın köməyi ilə öyrənilmişdir. Qaz qarışığının tərkibi reaktorun girişində və çıxışında analiz olunduğundan NOCl və $NO_2Cl$ üçün intensiv parçalanma qeyd olunmuşdur. Katalitik adsorbsiya və İQ-spektroskopik tədqiqatların nəticələri göstərdi ki, aktiv komponentlər ilə təbii seolitlərin qarşılıqlı təsirləri nəticəsində səthdə aktiv mərkəzlər əmələ gəlir ki, bunlar da dehidratlaşma reaksiyasına səbəb olurlar. Bu da tərkibində azotxloroksidləri olan qazların emalının katalitik – adsorbsiya sxemini yaratmağa imkan verir.




**Şəkil 3. Azot 4-oksidin təbii və $H^+$ forma klinoptilolitdə desorbsiyasının kinetik əyriləri**

$NO_2Cl$ və NOCl binar sistemlərinin birgə tədqiqatı göstərdi ki, 298K temperatur və 1 atm təzyiqdə onların $H^+$ formalı klinoptilolitdə ayrılması çox fərqlənirlər. Bu isə tədqiq olunan üsulla emal qazlarının azotun xloroksidlərindən təmizlənməsinə imkan yaradır. Turşuların təsirinə məruz qalmış və termiki emala uğramış seolitlərdən qazların $NO_2Cl$ və NOCl-dan ayrılmasında istifadə oluna bilər (Laleberov, Sitnikova, 2013:938-944; Vakhrusheva, Ivanova, Alokhina, Konkova, 2013:80-84).

Bu işdən (şək. 3, əyri 1) görünür ki, ən yaxşı adsorbsiya xassəsinə $H^+$ formalı seolitlər (şək. 3, əyri 2) təbii klinoptilolit malikdir. $NO_2$-in başlanğıc formada adsorbsiyası zamanı aktivliyinin artması müşahidə olunur. Seolitlər 673K-dən yuxarı temperaturda adsorbsiya aktivliklərini itirirlər. $H^+$ forma seolitlərin öyrənilməsi seolit və alümosilikatların kimyası üçün maraq doğurur. Seolitlərin öyrənilməsi kataliz proseslərinin problemlərindən olan aktiv mərkəzlərin əmələ gəlməsi və alümosilikat katalizatorlarının səthində gedən dönər kimyəvi çevrilmələrin təbiətinin aydınlaşdırılmasına imkan verir.

Effektiv sorbentlərin hazırlanmasının və onların regenerasiya prosesinin öyrənilməsi, havanın müxtəlif qarışıqlardan təmizlənməsi müasir şəraitdə çox aktualdır.

## Nəticə

Aparılan tədqiqatlardan belə nəticəyə gəlmək olur ki, müxtəlif qatılıqlı duzların (0,5÷1,0n) $NH_4Cl$ məhlulu ilə işlənmiş təbii klinoptilolit seolit nümunələri əsasında alınmış sorbentlərin effektliyi öyrənilmişdir, bu işdən görünür ki, ən yaxşı adsorbsiya xassəsinə malik $H^+$ formalı seolitldir. $NO_2$-in başlanğıc formada adsorbsiyası zamanı aktivliyinin artması müşahidə olunur. $H^+$ formalı seolitin nümunəsinin öyrənilməsi seolit və alimosilikatların kimyası üçün maraq doğurur. Kataliz proseslərinin problemlərindən olan aktiv mərkəzlərin əmələ gəlməsi və alimosilikat katalizatorlarının səthində gedən kimyəvi çevrilmələrin təbiətinin aydınlaşdırılması və onların regenerasiya prosesi, havanın müxtəlif qarışıqlardan təmizlənməsi öyrənilmişdir.

## Ədəbiyyat

1. Amirov, S.T. (2004). Tseolity Azerbaydzhana. Baku: Elm, 220 s.
2. Zhdanov, S.P., Yegorova, Ye.N. (1968). Khimiya tseolitov. L.: Nauka, s.101-110.
3. Mirskiy, YA.V., Pirozhkov, V.V. (1971). Adsorbenty, ikh polucheniye, svoystva i primeneniye. L.: Nauka, s.26.
4. Danilova, B.V., Zonkhayeva, E.L. (2013). Zhurn.Fiz.Khim. Ye. 87, № 8, s.1361-1365.
5. Chelishchev, N.F. (1973). Ionoobmennyye svoystva mineralov. M.: Nauka, s.12-105.
6. Yevdokimova, V.A., Karotsuba, L.P., Lankin, S.V. (2010). Izv. RGPU im. A.I.Gertsena, №122, s.15-21.
7. Abdurrakhmanov, F.A., Patiyev, A.R., Alekhina, M.B. (2010). Tekhn. T.24, № 9, s.85-89.
8. Annagiyev, M.KH. (1992). Adsorbenty na osnove prirodnykh tseolitov v protsessakh adsorbtsii razlichnykh gazov i parov. Baku: Elm, s.50-90.
9. Littl, L. (1969). Infrakrasnyye spektry adsorbirovannykh molekul. M.: Mir, 515 s.
10. Annagiyev, M.KH., Rustamova, Dzh.T. (2010). Azerb.Khim.Zhurn. № 2, s.97-99.
11. Senderov, E.E., Khitarov, N.I. (1970). Tseolity, ikh sintez i usloviya obrazovaniya v prirode. M.: Nauka, 395s.
12. Rustamova, Dzh.T., Efendi, A. Dzh., Nasiri, F.M., Bayramova, S.A., Aliyev, S.A., Mamedov, S.I., Mansurova, K.A. (2018). East European Science Journal, V.3, No.9(37), p.67-71.
13. Rabo, Dzh. (1980). Khimiya tseolitov i kataliz na tseolitakh. M.: Mir, T.1, 502 s.
14. Rustamova, Dzh.T., Efendi, A. Dzh., Aliyeva, A.M., Kozharova, L.I., Melikova, I.G., Aykan, N.F. (2015). Vtoraya Yevr-ya konf. po khim. naukam. Vena, Avstriya, s.28-31.
15. Pribylov, A.A., Skibitskaya, N.A., Zakel, L.A. (2014). Zhurn.Fiz.Khim. T.88, № 6, s.1043-1049.
16. Muminov, S.Z., Aripov, E.A. (1987). Issledovaniya v oblasti termodinamiki i termokhimii adsorbtsiina glinistykh mineralakh. Izd-vo «FAN» Uzbekskoy SSR, s.40-73.
17. Rustamova, Dzh.T., Efendi, A.Dzh., Aliyeva, A.M., Melikova, I.G., Kozharova, L.I., Shikhlinskaya, T.A. (2017). Neftepererabotka i neftekhimiya. Moskva, № 12, s.35-37.
18. Laleberov, A.A., Sitnikova, Ye.YU. (2013). Zhurn. Prikl., Khimii, T.83, № 6, s.938-944.
19. Vakhrusheva, Ye.M., Ivanova, Ye.N., Alokhina, M.B., Konkova, T.V. i dr. (2013). Uspekhi v khimii i khim.tekhnologii, T.27, №7, s.80-84.

Göndərildi: 19.06.2022 Qəbul edildi: 27.08.2022

## YER ELMLƏRİ VƏ COĞRAFİYA

## EARTH SCIENCES AND GEOGRAPHY

DOI: https://doi.org/10.36719/2707-1146/24/25-33

**Aynur Hikmət qızı Ələkbərli**
Masallı rayon R.Əlihəsənov adına
1 saylı tam orta məktəb
aynurelekberli419@gmail.com

# DAVAMLI İNKİŞAF STRATEGİYASI. AZƏRBAYCANDA DAVAMLI İNKİŞAF

**Xülasə**

Əhali artdıqca təbii ehtiyatlara tələbat da artır. Bununla belə, təbii sərvətlər tükənməz deyil və yaxın gələcəkdə onların bəzilərinin tamamilə tükənməsi ehtimalı var. İnsanlar təbii sərvətlərin ömrü boyu tükənə biləcəyini dərk etmir və yalnız tükəndikdən sonra böyük problemlərlə üzləşirlər.

Dünya əhalisinin daim artan tələbatı təbii ehtiyatların tükənməsi, iqtisadi böhranlar, ekoloji gərginlik, siyasi və sosial problemlər ilə nəticələnə bilər. Bunun qarşısını almaq üçün hər bir ölkə öz inkişaf strategiyasını müəyyən etməli və gələcək nəsillər üçün ehtiyatların qorunması yollarını araşdırmalıdır. Mütəxəssislər mövcud vəziyyətdən çıxış yolunu davamlı inkişafın təmin edilməsində görürlər.

Davamlı inkişaf modeli balanslaşdırılmış, davamlı və dinamik inkişaf modelidir. Bu model gələcək nəsillərin ehtiyaclarının tam ödənilməsinə təhlükə yaratmayan inkişaf hesab olunur.

Buraya iki əsas anlayış daxildir: ehtiyaclar anlayışı, xüsusən də birinci dərəcəli prioritetlərin predmeti olan yoxsul əhalinin mövcudluğu üçün zəruri olan ehtiyaclar və cəmiyyətin təşkili və texnologiyaların vəziyyəti ilə şərtlənən, ətraf mühitin cari və gələcək ehtiyacları ödəmək qabiliyyətinə qoyulan məhdudiyyətlər anlayışı.

***Açar sözlər***: *davamlı inkişaf konsepsiyası,davamlı inkişaf modeli, sosial inkişaf, iqtisadi inkişaf, ekoloji inkişaf, davamlı insan inkişafi*

**Aynur Hikmat Alakbarli**

## Sustainable development strategy. Sustainable development in Azerbaijan

**Abstract**

As the population increases, so does the demand for natural resources. However, natural resources are not inexhaustible, and in the near future some of them are likely to run out completely. people do not realize that natural resources can be exhausted during their lifetime, and only after they are exhausted, they face big problems.

The ever-increasing demand of the world's population can result in the depletion of natural resources, economic crises, environmental tensions, and political and social problems. In order to prevent this from happening, each country should determine its own development strategy and explore ways to preserve resources for future generations. Experts see the way out of the current situation in ensuring sustainable development.

The sustainable development model is a balanced, sustainable and dynamic development model. This model is considered a development that does not jeopardize the full satisfaction of the needs of future generations.

It includes two main concepts: the concept of needs, especially the needs necessary for the existence of the poor population, which should be the subject of first-order priorities and the concept of limits placed on the ability of the environment to meet current and future needs, conditioned by the organization of society and the state of technologies.

***Keywords***: *sustainable development concept, sustainable development model, social development, economic development, ecological development, sustainable human development*

## Giriş

XX əsrin sonunda insan təbiət münasibətlərinin tənzimləndiyi davamlı cəmiyyətə keçid haqqında bir çox təlim və konsepsiyalar yaradılmışdır. Hazırda dünya birliyi tərəfindən ən çox bəyənilən və tətbiq edilən inkişaf konsepsiyalarından biri "Davamlı inkişaf" ("Sustainable development") konsepsiyasıdır. Bu konsepsiyanın yaranması və qəbul edilməsi BMT-nin təbiəti mühafizə fəaliyyəti ilə əlaqədar olmuşdur. Hələ 1984-cü ildə BMT Baş Katibinin təşəbbüsü ilə BMT nəzdində "Ətraf mühit və inkişaf" üzrə Beynəlxalq Komissiya yaradılmışdır.




Davamlı inkişaf təbii ehtiyatlardan səmərəli istifadəni, enerji istehsalında alternativ enerji (tükənməyən) mənbələrinə keçməyi, istehsalda tullantıların azaldılmasını, innovasiya texnologiyalarının tətbiqini, yüksəkixtisaslı kadrların hazırlanmasını, əhali məşğulluğunun təmin edilməsini, ətraf mühitin qorunmasını və s.-ni nəzərdə tutur. Davamlı inkişaf konsepsiyasına görə, regionlardakı (ölkə, şəhər) iqtisadi, sosial və ekoloji problemlər kompleks şəkildə öyrənilməli, gələcəkdə yarana biləcək təhlükəli hallar qiymətləndirilməlidir. Davamlı inkişaf Norveç, İsveç, Almaniya, ABŞ, Yaponiya və s. İEÖ-lər üçün xarakterikdir.

## Davamlı İnsan İnkişafı və Göstəriciləri

Davamlı inkişafın mahiyyəti çağdaş nəsillərin rifahını təmin etmək və eyni zamanda gələcək nəsillərin inkişaf imkanlarını məhdudlaşdırmamaqdır. Bu, ilk növbədə, bilik va bacarıqların artırılmasını və insan potensialının inkişafını nəzərdə tutur. Təbii sərvətlərlə zəngin olan ölkələr üçün davamlı insan inkişafi xüsusi əhəmiyyət daşıyır. Bu səbəbdən "Qara qızıl"ın "insan qızılın"na çevrilməsi və bu məqsədlə insan potensialının inkişafı ən mühüm məsələlərdəndir ki, BMTiP milli qurum va beynəlxalq təşkilatlarla birlikdə müvəffəqiyyətlə Azərbaycanda həyata keçirilir. Davamlı insan inkişafı biliyə əsaslanır və onun məqsədlərinə nail olmaq və bu sahəni müvəffəqiyyətlə inkişaf etdirmək üçün həm əhali məlumatlandırılmalı, həm də mütəxəssislər xüsusi bilik və bacarığa malik olmalıdırlar. Bu səbəbdən Azərbaycan Respublikasında davamlı insan inkişafi həm ümumi, həm də ixtisaslaşmış orta və ali təhsilin proqramlarına daxil edilmişdir (Ələkbərov, 2007: 5).

İnsanın inkişafın məqsədi olmasını və insanın rifahının ən ali məqsəd olmasını nəzərə alaraq, XX əsrin son onilliyində yeni davamlı insan inkişafı göstəricilərinin istifadəsi təklif edilmişdir. Bu göstəricilərdən ən geniş tətbiq olunanı İnsanın İnkişafi Əmsalıdır. (İİƏ). Bu əmsalın hesablanması zamanı üç qrup göstəricidən istifadə olunur: sağlamlıq, təhsil və gəlir. Bu göstəricilər arasında İİƏ hər bir ölkə üçün hesablanır. Hesablamalar əsasında BMT xüsusi hesabatlar dərc edir. BMT-nin insan inkişafı adlanan hesabatlar 1990-cı ildən başlayaraq hər il dərc edilir (Ələkbərov, 2007: 13).

## BMT-nin Azərbaycanda Dayanıqlı İnkişaf Məqsədlərinə dəstəyi

BMT və onun tərəfdaşları Azərbaycanda Dayanıqlı İnkişaf Məqsədlərinə (DİM) nail olmaq istiqamətində çalışırlar. Bu tərəfdaşlıq nəticəsində Azərbaycan dayanıqlı inkişafın iqtisadi, sosial və

ekoloji aspektlərini əhatə edən 17 DİM-i, 88 hədəfi və 119 göstəricini prioritetləşdirib. 2017 və 2019-cu illərdə iki Könüllü Milli Hesabat (KMH) hesabatını təqdim etməklə Azərbaycan 2019-cu ilədək MDB məkanında ilk olaraq iki KMH təqdim edən ölkə olub (2).

Ölkə Prezidenti cənab İlham Əliyev Azərbaycan Respublikasının daha keyfiyyətli inkişaf mərhələsinə keçidini təmin edəcək yol xəritəsini müəyyənləşdirib. Azərbaycanda davamlı artan rəqabət qabiliyyətli iqtisadiyyat, dinamik, inklüziv və sosial ədalətə əsaslanan cəmiyyət, rəqabətli insan kapitalı və müasir innovasiyalar məkanının formalaşdırılması, işğaldan azad olunmuş ərazilərə böyük qayıdış və təmiz ətraf mühit və "yaşıl artım" ölkəsinin bərqərar edilməsi Prezident İlham Əliyevin "Azərbaycan 2030: sosial-iqtisadi inkişafa dair Milli Prioritetlər"in təsdiq edilməsi haqqında sərəncamına əsasən növbəti onillikdə ölkəmizin sosial-iqtisadi inkişafı naminə reallaşdırılacaq 5 Milli Prioritetdir. Milli Prioritetlər eyni zamanda BMT-nin "Dünyamızın transformasiyası: 2030-cu ilədək davamlı inkişaf sahəsində Gündəlik"dən irəli gələn öhdəliklərin icrası istiqamətində də xüsusi əhəmiyyət kəsb edir. Bu baxımdan gələcək nəsildə davamlı inklüziv inkişaf sahəsində bilik və bacarıqların formalaşdırılması və göstərilən istiqamətdə elmi-tədqiqat işlərinin stimullaşdırılması olduqca aktualdır (3).

**Davamlı inkişafın siyasi, iqtisadi və sosial əsasları Azərbaycanda**

Dəyişən dünyada davamlı inkişafın təmin edilməsi mürrəkəb bir məsələ olduğu üçün, hər bir ölkə öz imkanlarını dəyərləndirərək müvafiq sosial-iqtisadi inkişaf strategiyası yeridir. Bu baxımdan Azərbaycanın inkişafı, sosial-iqtisadi inkişafı xüsusi olaraq diqqəti cəlb edir. Azərbaycanın yeritdiyi iqtisadi siyasətin nəticələri əldə edilmiş uğurlar və irəliləyişlərdə özünü bir daha təsdiqləyir. 2005-2015-cü illərdə Azərbaycanın ÜDM 3 dəfədən və dövlət büdcəsi 13 dəfədən çox artmışdır. Bu dövr ərzində ölkəyə 200 milyard dollar investisiya yatırılmışdır, o cümlədən 132 milyard dollar qeyri-neft sektoruna yönəldilmişdir. Respublikada valyuta ehtiyatlarının həcmi 50 mlrd. dolları ötmüş, yoxsulluğun səviyyəsi isə 4,9%-ə qədər aşağı düşmüşdür. Ölkəmizdə neftdən əldə olunan gəlirlər qeyri-neft sektorunun inkişafına yönəldilir. Bunun nəticəsi kimi, son illərdə Azərbaycanın qeyri-neft sektoruna yönəldilən investisiyalar 2 dəfə artmışdır (İsmayılov, Abdullayev, Qurbanova, Hüseynova, Zeynalova, Nağıyev, Seyidzadə, Həsənov, 2018: 252).

Azərbaycanda aşkar edilmiş neft və qaz ehtiyatları və onların geniş miqyasda mənimsənilməsi yaxın 100 ildə respublikanın enerji təhlükəsizliyinə zəmin yaradır. Lakin karbohidrogen ehtiyatlarının tükənən ehtiyatlara aid edilməsi gələcəkdə yeni enerji mənbələrinin istifadəsini zəruriləşdirir. Bunu nəzərə alaraq, artıq müasir dövrdə alternativ enerji mənbələrinin istifadə edilməsi məsələsi gündəlikdə durur. Azərbaycanın əlverişli təbii iqlim şəraiti alternativ enerji mənbələrindən (əsasən günəş və külək enerjisi) istifadə imkanlarını müəyyən edir. Bununla əlaqədar respublikada müvafiq Agentlik yaradılıb və bir neçə regionda (Abşeron yarımadası, Mərəzə qəsəbəsi və digər yerlərdə) külək və günəş enerjisindən istifadə mərkəzləri fəaliyyət göstərir. Respublikada bu sahədə ilk addımlar atıldığını nəzərə alaraq (eyni zamanda, qeyd etmək lazımdır ki, keçmişdə Abşeron kəndlərinin bəzilərində külək enerjisinin istifadə edən qurğuları vasitəsilə quyulardan içməli su çıxarılırdı), xarici ölkələrin təcrübəsindən bəhrələnmək məqsədəuyğun hesab edilə bilər. Məsələn, Avropa ölkələrinin enerji istehsalının təxminən 10%-ni külək enerji istehsalı təşkil edir. Burada külək enerjisini istifadə edən qurğuların ümumi gücü 128, 8 QVt-a çatır. 2030-cu ildə bu göstərici Avropa Birliyi ölkələrində iki dəfə artaraq 254 QVt-a bərabər olacaq və bu ölkələrin enerjiyə olan tələbatının 24, 4%-ni ödəyəcəkdir. Azərbaycanda yüksək texnologiyalar sektorunun son beş ildə 3,5 dəfəyədək artmış, aktiv internet istifadəçilərinin xüsusi çəkisi 72%-ə bərabərdir. Son 12 ildə yüksək texnologiyalar sahəsi üzrə 41 milyon dollarlıq mal və məhsul ixrac edib. Azərbaycanın ümumi daxili məhsulu Cənubi Qafqaz ölkələrinin məcmu ÜDM-in 75%-ni təşkil edir. Əlbəttə ki, neft gəlirlərindən, bu imkanlardan istifadə etməklə qeyri-neft sektorunun inkişaf etdirilməsi, dövlət gəlirlərinin neftdən asılılığının azaldılması əsas prioritetlər sırasındadır. Bu prioritetlər «Azərbaycan 2020: Gələcəyə baxış» İnkişaf Konsepsiyasında əks olunmaqla, burada resurslardan istifadənin səmərəliliyinin yüksəldilməsi, rəqabət qabiliyyətli istehsal sahələrinin yaradılması nəzərdə tutulur.

Azərbaycan "davamlı inkişaf məqsədləri indeksi"nə görə dünyada hər üç ölkədən ikisini qabaqlayıb.

Bu göstəricilərə görə respublikamız regional liderdir və 54-cü yerdə qərarlaşaraq bütün qonşularını geridə qoyub.

Hesabatda Rusiya 57-ci, Gürcüstan 58-ci, İran 59-cu, Qazaxıstan 65-ci, Türkiyə 70-ci, Ermənistan 75-ci və Türkmənistan 114-cü mövqedədir. Ölkəmiz səhiyyə, rifah, yoxsulluq, qidalanma, təmiz su, təmiz enerji, davamlı şəhərlər və icmalar, sülh, ədalət və güclü institutlar kimi BMT-nin Davamlı İnkişaf Məqsədləri üzrə irəliləyişə nail olub.

Azərbaycan "davamlı inkişaf məqsədləri indeksi"nin mümkün 100 balından 72,6 bal toplayıb. Müqayisə üçün demək olar ki, Şərqi Avropa və Mərkəzi Asiya regionunda bu indeks üzrə orta göstərici 70,9-dur (5).

**Dayanıqlı İnkişaf Məqsədləri**

Minilliyin İnkişaf Məqsədlərinin nailiyyətlərini davam etdirəcək yeni qlobal inkişaf çərçivəsinin müəyyənləşdirilməsi üzrə danışıqlar 2012-ci ildən 2015-ci ilədək davam etdi. Yekun sənəd 2015-ci ilin sentyabrında ABŞ-ın Nyu-York şəhərində keçirilən BMT-nin Dayanıqlı İnkişaf Sammitində imzalandı. 25 sentyabr 2015-ci il tarixində BMT-nin Baş Assambleyasının üzvü olan 193 dövlət tərəfindən "2030-cu ilədək dayanıqlı inkişaf sahəsində Gündəlik" qəbul edildi. Gündəlik 92 bənddən ibarətdir və 51-ci bənddə 17 Davamlı İnkişaf Məqsədi və əlaqəli 169 hədəf göstərilir (6).

**Məqsəd 1.Yoxsulluğun bütün formalarına hər yerdə son qoymaq.** 1990-cı ildən bəri, kəskin yoxsulluq səviyyəsi yarıdan çox azaldılmışdır. Bu nailiyyət diqqətəlayiq olsa da, inkişaf etməkdə olan bölgələrdə hələ də, hər beş nəfərdən biri gündəlik 1,25 ABŞ dollarından az gəlirlə yaşayır və milyonlarla insanın gündəlik gəliri bu məbləğdən cüzi dərəcədə yüksəkdir. Üstəlik, bir çox insanlar yenidən yoxsulluğa düçar olma riski ilə üzləşir. Hazırda 836 milyon insan hələ də kəskin yoxsulluq həddində yaşayır. İnkişaf etməkdə olan ölkələrdə təxminən hər 5 nəfərdən biri günə 1,25 ABŞ dollarından az qazancla yaşayır. Dünyada beş yaşadək hər dörd uşaqdan birinin boyu öz yaşına görə qeyri-adekvatdır. Qeyri-stabil vəziyyətdə olan və münaqişələrdən əziyyət çəkən kiçik ölkələrdə yüksək yoxsulluq səviyyəsinə daha çox rast gəlinir. 2014-cü ildə hər gün 42 min insan münaqişələrlə bağlı olaraq, sığınacaq axtarmaq üçün evlərini tərk etmək məcburiyyətində qalmışdır.Yoxsulluq sadəcə yaşayış vasitələrinin dayanıqlılığını təmin etmək üçün lazım olan gəlir və resursların çatışmazlığından ibarət deyil. O, aclıq və zəif qidalanma, təhsilə və digər əsas xidmətlərə çıxış imkanının məhdud olması, sosial ayrı-seçkilik və təcridolunma, eləcə də qərarların qəbul edilməsində iştirakın olmaması formalarında təzahür edir. Dayanıqlı iş yerlərinin və bərabərliyin təşviq edilməsini təmin etmək üçün iqtisadi inkişaf inklüziv xarakter daşımalıdır.

**Məqsəd 2. Aclığa son qoymaq, ərzaq təhlükəsizliyini təmin etmək, qidalanmanı yaxşılaşdırmaq və kənd təsərrüfatının dayanıqlı inkişafına dəstək vermək.** Ərzaq məhsullarını necə yetişdirdiyimizi, paylaşdığımızı və istehlak etdiyimizi yenidən düşünmək vaxtıdır. Düzgün şəkildə həyata keçirildiyi təqdirdə, kənd təsərrüfatı, meşəçilik və balıqçılıq insanların yaşayışının yaxşılaşmasına yönələn aqrar inkişafa və ətraf mühitin qorunmasına dəstək verməklə, hər kəs üçün qidalı ərzaq təmin edə və layiqli gəlir yarada bilər.

Hal-hazırda torpaqlar, şirin sular, okeanlar, meşələr və bioloji müxtəliflik sürətlə azalır. İqlim dəyişikliyi bizim asılı olduğumuz resurslara, quraqlıq və daşqınlar kimi təbii fəlakətlərlə əlaqəli risklərin artımına daha çox təzyiq göstərir. Kənd yerlərində yaşayan bir çox qadınlar və kişilər öz torpaqlarında çətinliklə dolanırlar, bu da onları fürsətlər axtarmaq üçün şəhərlərə köçməyə məcbur edir (7).

Bu gün aclıqdan əziyyət çəkən 795 milyon nəfər insanı və 2050-ci ilə qədər aclıqdan əziyyət çəkən daha 2 milyard insanı qidalandırmaq üçün qlobal ərzaq və kənd təsərrüfatı sisteminin əsaslı şəkildə dəyişdirilməsinə ehtiyac vardır.

Ərzaq və kənd təsərrüfatı sektoru inkişaf üçün əsas həll yollarını təmin edir və aclıq və yoxsulluğun aradan qaldırılmasında mərkəzi rol oynayır.

**Məqsəd 3. Yaşından asılı olmayaraq hamının sağlam yaşayış tərzini təmin etmək və rifah halını yaxşılaşdırmaq.** Yaşından asılı olmayaraq hamı üçün sağlam həyat tərzini təmin etmək və rifah halını yaxşılaşdırmaq dayanıqlı inkişaf üçün vacibdir. Gözlənilən ömür uzunluğunun artırılması və uşaq və ana ölümü ilə əlaqəli geniş yayılmış ölüm səbəblərinin azaldılması ilə əlaqədar əhəmiyyətli addımlar atılmışdır. Təmiz su və sanitariya xidmətlərinə çıxış imkanlarının genişləndirilməsi, malyariya, vərəm, poliomielit və İİV/QİÇS xəstəliklərinin yayılmasının azaldılması istiqamətində böyük irəliləyişlər əldə edilmişdir. Bununla yanaşı, daha çox xəstəliklərin tam aradan qaldırılması və bir çox müxtəlif davamlı və yeni ortaya çıxan sağlamlıq problemlərini həll etmək üçün daha çox səy göstərmək lazımdır.

**Məqsəd 4. Hamı üçün inklüziv və bərabər keyfiyyətli təhsili təmin etmək və ömür boyu təhsil almaq imkanlarını dəstəkləmək.** Keyfiyyətli təhsil almaq insanların həyatını və dayanıqlı inkişafı yaxşılaşdırmaq üçün əsasdır. Bütün səviyyələrdə təhsilə çıxış imkanının artırılması və xüsusilə qadınlar və qızlar üçün məktəblərə qeydiyyat dərəcələrini artırma istiqamətində böyük irəliləyişlər olmuşdur. Əsas savadlılıq bacarıqları yüksək inkişaf etmişdir, lakin universal təhsil məqsədlərinə nail olma istiqamətində uğurlu addımlar atmaq üçün daha çox səy göstərmək lazımdır. Məsələn, dünyada qızlar və oğlanlar arasında ibtidai təhsildə bərabərliyə nail olunmuşdur, lakin yalnız bir neçə ölkə bu hədəfə təhsilin bütün səviyyələrində çatmışdır.

**Məqsəd 5. Gender bərabərliyinə nail olmaq, bütün qız və qadınların hüquq və imkanlarını genişləndirmək.** Minilliyin İnkişaf Məqsədləri çərçivəsində dünyada gender bərabərliyi və qadınlara səlahiyyət verilməsi sahəsində irəliləyişə nail olunmasına baxmayaraq (qızlar və oğlanların ibtidai təhsilə bərabər çıxış imkanları əldə etməsi daxil olmaqla), dünyanın hər yerində qadınlar və qızlar ayrı-seçkilik və zorakılıqdan əziyyət çəkirlər (8).

Gender bərabərliyi yalnız əsas insan hüququ deyil, sülh, rifah və dayanıqlı dünya üçün zəruri bir təməldir. Qadınlar və qızların təhsilə, səhiyyə xidmətlərinə, layiqli işə bərabər çıxış imkanlarının siyasi və iqtisadi qərarların qəbulu proseslərində iştiraklarının təmin olunması dayanıqlı iqtisadiyyatı canlandıracaq cəmiyyətə və insanlığa böyük fayda gətirəcəkdir.

**Məqsəd 6. Hamı üçün su və sanitariyaya əlçatanlığı və dayanıqlı idarəetməni təmin etmək.** Hamı üçün təmiz, əlçatan su yaşamaq istədiyimiz dünyanın vacib bir hissəsidir. Buna nail olmaq üçün planetdə kifayət qədər şirin su var. Lakin zəif iqtisadiyyat və ya zəif infrastruktura görə, hər il əksəriyyəti uşaqlar olmaqla milyonlarla insan, qeyri-kafi su təchizatı, sanitariya və gigiyena ilə əlaqədar xəstəliklərdən ölür.

Su çatışmazlığı, aşağı keyfiyyətli su və qeyri-kafi sanitariya dünyadakı yoxsul ailələrin ərzaq təhlükəsizliyinə, yaşayış şəraitinə və təhsil imkanlarına mənfi təsir göstərir. Quraqlıq dünyanın ən yoxsul ölkələrindən bəzilərində aclıq və zəif qidalanmanın kəskinləşməsinə səbəb olur.

2050-ci ilə qədər hər dörd nəfərdən ən az birinin uzunmüddətli və ya təkrarlanan şirin su çatışmazlığına məruz qalan ölkələrdə yaşayacağı ehtimal olunur.

**Məqsəd 7. Hamının sərfəli, etibarlı, dayanıqlı və müasir enerji mənbələrinə çıxışını təmin etmək.**

Bu gün dünyanın qarşılaşdığı istənilən əsas problem və fürsətlərin mərkəzində enerji dayanır. İş, təhlükəsizlik, iqlim dəyişikliyi, qida istehsalı və ya gəlirlərin artımı üçün enerjiyə çıxış imkanının olması vacibdir.

Dayanıqlı enerji fürsətdir − həyatın, iqtisadiyyatın və planetin transformasiyasına imkan verir.

BMT-nin keçmiş Baş katibi Pan Ki Mun müasir enerji xidmətlərinə universal çıxışı təmin etmək, səmərəliliyi artırmaq, alternativ və bərpa olunan enerji mənbələrindən istifadəni artırmaq üçün "Hamı üçün Dayanıqlı Enerji" təşəbbüsünə rəhbərlik edir.

**Məqsəd 8. Davamlı, inklüziv və dayanıqlı iqtisadi artımı, hamı üçün tam və məhsuldar məşğulluğu və layiqli işi təşviq etmək.** Dünya əhalisinin təxminən yarısı günə 2 ABŞ dolları məbləğindən az qazancla yaşayır. Bir çox yerlərdə, iş sahibi olmaq yoxsulluqdan qurtulmaq qabiliyyətinə zəmanət vermir. Bu yavaş və qeyri-bərabər irəliləyiş bizdən yoxsulluğun aradan qaldırılmasına yönəlmiş iqtisadi və sosial siyasətlərimizi yenidən nəzərdən keçirməyi və yenidən hazırlamağı tələb edir.

Layiqli iş imkanlarının çatışmazlığının davam etməsi, yetərsiz investisiya qoyuluşları və qeyri-kafi istehlak demokratik cəmiyyətlərin təməlini təşkil edən əsas sosial həmrəyliyin pozulmasına gətirib çıxarır: tərəqqi hamı üçün ortaq olmalıdır. Keyfiyyətli iş yerlərinin yaradılması 2015-ci ildən sonra demək olar ki, bütün iqtisadiyyatlar üçün əsas problem olaraq qalacaqdır.

Dayanıqlı iqtisadi artım cəmiyyətdən ətraf mühitə zərər verməməklə, insanların keyfiyyətli işlərə sahib olmasına imkan verərək iqtisadiyyatı stimullaşdıran şəraitlər yaratmasını tələb edir. Həmçinin, bütün əmək qabiliyyətli əhali üçün iş imkanları və layiqli iş şəraiti də tələb olunur.

**Məqsəd 9. Möhkəm infrastruktur yaratmaq, inklüziv və dayanıqlı sənayeləşməni təşviq etmək və innovasiyalara dəstək vermək.** İnfrastruktura, o cümlədən nəqliyyat, suvarma, enerji və informasiya və kommunikasiya texnologiyaları infrastrukturuna investisiya qoyuluşları bir çox

ölkələrdə dayanıqlı inkişafa nail olmaq və icmaları səlahiyyətləndirmək üçün vacibdir. Uzun müddətdir təsdiq olunur ki, məhsuldarlıq və gəlirlərin artması, səhiyyə və təhsil nəticələrinin yaxşılaşdırılması üçün infrastruktura investisiya qoyuluşu tələb olunur. İnklüziv və dayanıqlı sənaye inkişafı gəlirlərin yaranmasının əsas mənbəyidir, bütün insanların həyat səviyyəsinin sürətlə və davamlı artmasına imkan verir və ekoloji təmiz sənayeləşmə üçün texnoloji həllər təqdim edir. Texnoloji irəliləyiş artan resurs və enerji səmərəliliyi kimi ekoloji məqsədlərə nail olmaq üçün göstərilən səylərin təməlidir. Texnologiya və innovasiya olmadan sənayeləşmə baş verməyəcək və sənayeləşmə olmadan inkişaf ola bilməz.

**Məqsəd 10. Ölkədaxili və ölkələrarası bərabərsizliyi azaltmaq.**

Beynəlxalq ictimaiyyət insanları yoxsulluqdan xilas etmək üçün ciddi addımlar atmışdır. Ən həssas ölkələr − ən az inkişaf etmiş ölkələr, dənizə çıxışı olmayan inkişaf etməkdə olan ölkələr və inkişaf etməkdə olan kiçik ada dövlətləri − yoxsulluğun azaldılması istiqamətində irəliləyişlər əldə etməkdə davam edirlər. Ancaq bərabərsizlik hələ də davam edir, səhiyyə və təhsil xidmətlərinə və digər aktivlərə çıxışlarda böyük fərqlər qalır. Bundan əlavə, ölkələr arasında gəlirlərin bərabərsizliyi azalmış ola bilər, lakin ölkə daxilindəki bərabərsizlik artmışdır. İqtisadi inkişafın inklüziv olmadığı və dayanıqlı inkişafın üç aspektini − iqtisadi, sosial və ətraf mühit aspektlərini özündə birləşdirmədiyi təqdirdə yoxsulluğun azaldılması üçün yetərli olmadığına dair konsensus getdikcə güclənir.

Bərabərsizliyi azaltmaq üçün əlverişsiz vəziyyətdə olan və təcrid olunmuş icmaların ehtiyaclarına diqqət yetirilməsi baxımından siyasətlər prinsip etibarilə universal olmalıdır.

**Məqsəd 11. Şəhər və yaşayış məntəqələrinin açıqlığını, təhlükəsizliyini, davamlılığını və ekoloji dayanıqlılığını təmin etmək.** Şəhərlər ideyalar, ticarət, mədəniyyət, elm, məhsuldarlıq, sosial inkişaf və s. üçün mərkəzlərdir. Ən yaxşı halda, şəhərlər insanlara sosial və iqtisadi cəhətdən inkişaf etməyə imkan verir. Bununla belə, torpaqlara təzyiq göstərmədən yeni iş imkanları və rifah yaratmağa davam etməklə şəhərlərin qorunmasında bir çox çətinliklər var. Şəhərlərdə ən çox rast gəlinən problemlərə əhali sıxlığı, əsas xidmətlərin göstərilməsi üçün vəsait çatışmazlığı, adekvat mənzil təminatının çatışmazlığı və azalan infrastruktur daxildir. Şəhərlərin üzləşdiyi problemləri aradan qaldırmaq üçün resurslardan istifadənin təkmilləşdirilməsi, çirklənmənin və yoxsulluğun azaldılması ilə yanaşı, onların inkişaf etməsinə və böyüməsinə imkan verən üsullardan istifadə oluna bilər. Hamı üçün imkanlar yaradan, o cümlədən əsas xidmətlərə, enerjiyə, mənzil təminatına, nəqliyyata və digər imkanlara çıxış yaradan şəhərlər arzu etdiyimiz gələcəyin bir parçasıdır.

**Məqsəd 12. İstehsal və istehlakın səmərəli modellərinə keçidi təmin etmək.**

Dayanıqlı istehlak və istehsal resurs və enerji səmərəliliyinin, dayanıqlı infrastrukturun təşviqi və əsas xidmətlərə, "yaşıl" və layiqli işlərə çıxış imkanı və hər kəs üçün daha yaxşı həyat keyfiyyətinə nail olunmasıdır. Onun həyata keçirilməsi ümumi inkişaf planlarına nail olmağa, gələcək iqtisadi, ekoloji və sosial xərcləri azaltmağa, iqtisadi rəqabətliliyi gücləndirməyə və yoxsulluğun azaldılmasına kömək edir. Dayanıqlı istehlak və istehsalın məqsədi həyat keyfiyyətinin artırılması fonunda, resurslardan istifadənin, deqradasiyanın və çirklənmənin azaldılması yolu ilə iqtisadi fəaliyyətlərdən əldə olunmuş rifah dərəcəsini artıraraq "daha az resursla daha çox şeyə daha yaxşı şəkildə nail olmaq"dır. Bu, müxtəlif maraqlı tərəfləri, o cümlədən iş adamları, istehlakçılar, siyasətçilər, tədqiqatçılar, alimlər, pərakəndə satıcılar, KİV və inkişaf sahəsində əməkdaşlıq edən qurumlar və başqalarını əhatə edir. İstehsalçıdan son istehlakçıya qədər tədarük zəncirində fəaliyyət göstərən iştirakçılar arasında sistemli yanaşma və əməkdaşlıq da tələb olunur. Buna istehlakçıların dayanıqlı istehlak və həyat tərzləri ilə bağlı maarifləndirilmə tədbirlərinə və təlimə cəlb olunmaları, istehlakçıların standartlar və etiketlərlə bağlı müvafiq məlumatlarla təmin edilməsi və dövlət satınalmalarının dayanıqlı şəkildə həyata keçirilməsi daxildir (9).

**Məqsəd 13. İqlim dəyişikliyi və onun təsirlərinə qarşı mübarizə üzrə təcili tədbirlər görmək.**

İqlim dəyişikliyi hər bir qitədəki hər bir ölkəyə təsir edir. Bu, milli iqtisadiyyatları pozur və həyatlara təsir edir, insanlar, cəmiyyətlər və ölkələrə bu gün və hətta gələcəkdə baha başa gəlir. İnsanlar iqlim dəyişikliyinin, o cümlədən dəyişən hava şəraitinin, dəniz səviyyəsinin qalxmasının və daha ekstremal hava hadisələrinin təsirlərinə məruz qalırlar. İnsan fəaliyyəti nəticəsində yaranan "istixana" effekti yaradan qazların emissiyaları iqlim dəyişikliyinə təkan verir və artmağa davam edir. İndi onlar tarixdəki ən yüksək səviyyəyə çatmışdır. Heç bir tədbir görülməzsə, dünyanın orta səth temperaturunun XXI əsrdə yüksələcəyi proqnoz olunur və bu əsr 3°C artacağı ehtimal olunur, dünyanın bəzi ərazilərinin daha

